Burada TS – 1 qramda tırtılın (qurdun) sayı, əd;
QS-1 qramda qrenanın sayı, əd;
QD-qrenanın dirilməsi, %;
29,0-1 qutuda qrenanın kütləsi, qr;
19,0-1 qutuda qurdun kütləsi, qr;
100-faizi ədədə çevirmək üçün əmsal.

4) Yaşama qabiliyyəti - 3-cü yaşdan başlayaraq xəstə və ölmüş qurdların və pupların uçotu aparılmışdır;

5) Yemləmə müddəti - yemləmənin başlanması, qurdların saxa getməsinin başlanması və qurtarması tarixlərinin qeydiyyatı əsasında;

6) Baramanın bioloji göstəriciləri - hər təkrardan 25 dişi (♀) və 25 erkək (♂) barama götürüləcək, cinsiyyətinə görə ayrılıqda əvvəlcə baramalar, sonra isə barama pərdələri elektron tərəzidə çəkilmişdir, sonra hesablama əsasında təyin olunmuşdur.

7) Bir qram qurddan barama məhsulu – (E.N.Mixaylov, P.A. Kovalyova görə)

$$\text{B.m.} = \frac{b.o.k.Xq.sXy.q}{100}$$

**burada:** B.m. - barama məhsulu, kq;
b.o.k. - baramanın orta kütləsi, qr;
q.s. - 1 qramda qurdun sayı, əd;
y.q - qurdların yaşama qabiliyyəti, %.

8) Məhsuldarlıq göstəriciləri - müvafiq düsturlar əsasında hesablama yolu ilə təyin edilmişdir.

**Tədqiqat işinin məqsədi:** dəyişən ekoloji mühit şəraitində yüksək və sabit məhsuldarlığı təmin edən, yəni ekoloji mühitə dözümlü yeni tut ipəkqurdu hibridlərinin yaradılması və respublikamızda rayonlaşdırılmalıdır.

**Tədqiqat işinin vəzifələri**: müxtəlif xüsusiyyətli, müxtəlif mənşəli cinslərdən istifadə etməklə yeni hibrid kombinasiyaları yaratmaq, sınağını keçirmək, ən yüksək məhsuldarlığa və ekoloji mühitə dözümlü olan kombinasiyaları (hibridləri) seçib Kənd Təsərrüfati Nazirliyi yanında Aqrar Xitmətlər Agentliyinə təqdim etməkdir.

İşin aparılması üçün Heyvandarlıq Elmi-Tədqiqat İnstitutunun "Tut ipəkqurdunun seleksiyası laboratoriya"sında yaradılmış Uğur, Ordubad-1, Ordubad-2, Muğan-1 və Muğan-2, Gürcüstan ETİİ-dan introduksiya olunmuş Mizuri-1 və Muziri-5 və nəzarət olaraq Mayak-2 və Mayak-3 cinslərindən və Mayak-2×Mayak-3 hibridindən istifadə olunmuşdur (Bədəlov, 2001).

Təcrübələr 2023-cü ildə 9 cins və 21 hibrid üzərində aparılmışdır. Nəzarət kimi respublikamızda rayonlaşmış Mayak-2xMayak-3 hibridindən və onun valideyn cinslərindən istifadə olunub**.** Hər cins (variant) 3 təkrardan, həm təkrar 200 qurddan ibarət olaraq təcrübə qoyulub. İlkin olaraq cinslər tut ipəkqurdunun III yaşının sonunadək optimal şəraitdə yemləndirildi. Sonra 2 hissəyə ayrılaraq yemlənildi. 1-ci hissə yenə optimal, 2–inci hissə isə pessimal şəraitdə yemlənildi.

Təcrübələr 2 müxtəlif mühitdə (optimal və pessimal) aparılmışdır. Adətən respublikamızın aran rayonlarında aparılan tut ipəkqurdu yemləmələrinin IV və V yaşı isti və quru dövrlərə düşür. İstiliyin çox, rütubətin az olması səbəbindən yarpaq tez soluxur, keyfiyyətini itirir. Bütün bunları nəzərə alaraq IV və V yaşlarda pessimal mühit yaradılmışdır (Hüseynova, Musayeva, 2020).

Cinsarası çarpazlaşdırma pessimal mühitdə, cins daxili çütləşmə isə optimal mühitdə aparılmışdır. Optimal şəraitdə hazırlanmış cinslərin qrenası növbəti ildə də optimal, hibridlər isə pessimal şəraitdə sınaqdan keçirildi **(**Hüseynov, Eminbəyli**,** 1973; Hüseynov, Eminbəyli, 1974). Yemləmələri aparılmış tut ipəkqurdu cinslərinin bioloji göstəriciləri cədvəldə verilmişdir.

**Cədvəl. Cinslərin bioloji göstəriciləri.**

| № | Cinslərin adı | Orta kütləsi | | İpəklilik, % |
|---|---|---|---|---|
| | | baramanın, q | ipəyin, mq | |
| **1** | Muğan-1 | 2,13 | 388 | 18,2 |
| **2** | Muğan-2 | 2,05 | 396 | 19,3 |
| **3** | Mizuri-1 | 2,19 | 417 | 19,0 |
| **4** | Mizuri-5 | 2,05 | 389 | 19,0 |
| **5** | Mayak-2 | 1,91 | 365 | 19,0 |
| **6** | Mayak-3 | 1,94 | 382 | 19,7 |
| **7** | Ordubad-1 | 2,14 | 392 | 18,3 |
| **8** | Ordubad-2 | 2,09 | 380 | 18,2 |
| **9** | Uğur | 2,10 | 404 | 19,2 |

Baramaların və barama pərdəsinin orta göstəricisi təyin edildi və həm pərdənin, həm də baramanın orta kütləsindən yüksək olanlar papilyonaj üçün seçildi və damazlıq toxum almaq üçün papilyonaja buraxıldı **(**Mamedov**,** 1961**)**. Cədvəldən məlum olur ki, diri baramanın orta kütləsi cinslər üzrə 1,91-2,19 q arasında dəyişir. Diri baramanın orta kütləsinə görə ən yüksək göstərici Mizuri-1 (2,19q), Ordubad-1 (2,14q) cinslərində, ən aşağı göstərici isə Mayak-2 (1,91q) cinsində alınmışdır. İpəyin orta kütləsi cinslər üzrə 365-417mq arasında tərəddüd edir. Bu göstəriciyə görə ən yaxşı nəticə yenə Mizuri-1 (417mq) cinsində, ən az nəticə isə Mayak-2 (365mq) cinsində alınmışdır. Cinslərdə ipəklilik 18,2-19,7% arasında tərəddüd edir. Mayak-3 cinsində ipəklilik ən çox (19,7%) olmuşdur. Papilyonaj başa çatdıqdan (yəni kəpənəklər toxum tökdükdən) sonra qrena düzümləri seçildi və sentyabr ayının əvvəllərinə qədər tələb olunan istilik və nəmlik şəraitində kümxanada saxlanıldı (Mamedov,Gasanova, Tagieva, Nabieva, 2010). Sentyabr-oktyabr aylarında cinslərin kəpənəklərinin mikroskop müayinəsi aparıldı. Mikroanalizdən xəstə çıxan ailələrin kəpənəklərinin qrena düzümləri məhv edildi. Sağlam düzümlərin qrenaları sayılmış, kənar qatışıqlardan təmizlənmişdir (Guseynova, Musaeva, 2021).

Cinslərdən hibrid kombinasiyalar almaq üçün əvvəlcədən popilyonaj sxemi qurulmuş və adları aşağıda qeyd alunan hibridlərin qrenası hazırlanmışdır: 1) Ordubad-1×Muğan-1; 2) Ordubad-1×Muğan-2; 3) Ordubad-1×Mizuri-1; 4) Ordubad-1×Mizuri-5; 5) Ordubad-1×Uğur; 6) Ordubad-2×Muğan-1; 7) Ordubad-2×Muğan-2; 8) Ordubad-2×Mizuri-1; 9) Ordubad-2×Mizuri-5; 10) Ordubad-2×Uğur; 10) Mayak-2×Mayak-3 (nəzarət variantı).



**IV yaş dövrü**

## Nəticə

1. Muğan-1 (98,0%), Mayak-3 (98,0%) və Ordubad-1 (98,0%) cinslərində qrenanın dirilmə faizi ən yüksək olmuşdur.
2. Baramanın orta kütləsinə görə ən yüksək göstərici Mizuri-1 (2,19q) və Ordubad-1 (2,14q) cinslərində olmuşdur.
3. İpəyin orta kütləsinə görə yenə ən yüksək göstərici Mizuri-1 (417mq) və Uğur (404mq) cinslərində olmuşdur.
4. 9 cinsin Azərbaycan Respublikası ipəkçiliyi üçün tövsiyə olunmuş aqrozootexniki qaydada yemləməsi aparılmışdır.

## Ədəbiyyat

1. Abbasov, B.H. (2009).İpəkçilikdə seleksiyanın nəzəri və praktiki əsasları. Gəncə: İlkin MMC, 277 s.
2. Abbasov, B.H. (2010). Tut ipəkqurdu cinslərinin və hibridlərinin optimal hipotetik modeli. AzETİİ-nin xəbərləri, №1.
3. Məmmədov, Q.M. (2019). Ipəkçilərin məlumat kitabı Gəncə.201 səh.
4. Məmmədov, Q.M. (2018). İpəkçilikdə yeni texnologiya”, Göygöl. 91 səh.
5. Adıgözəlova, D.M. (2020). Tut ipəkqurdunun bəslənilməsi qaydaları, Gəncə. s.160.
6. Bədəlov, N.H., Məmmədov, Q.M., Hüseynova, E.Ə. (2001). Yeni tut ipəkqurdu cinsləri // Azərbaycan Aqrar elmi, № 3-4, s. 88-89.
7. Hüseynova, R.R., Musayeva, S.R. (2020). Tut ipəkqurdlarının bəslənilməsi qaydaları, Göygöl.19 səh.
8. Hüseynov, R.A., Eminbəyli, S.N. (1973). İstiliyə dözümlü yeni tut ipəkqurdu xətlərinin seçilməsi: AzETİİ-nin əsərləri; VIII c.
9. Hüseynov, R.A., Eminbəyli, S.N. (1974). İstiliyə dözümlü Aran cinsi, AzETİİ-nin əsərləri; IX c.
10. Mamedov, G.M. O mezjsezonnom skreshivanii tutovogo shelkopryada // Shelk, 1961, №3, s. 35-36
11. Mamedov, G.M., Gasanova E.M., Tagieva Sh.T., Nabieva, N.M. (2010). Vlyanie razlichnikh temperatur i otnositelnoy vlajnosti na biologicheskie i produktivnie pokazateli gibridov tutovogo shelkopryada porodi. //Jurnal Nauchnikh Novostey, AzNIISH Gyandja, s. 55-65
12. Guseynova, R.R., Musaeva, S.R. Vlyanie lekarstvennikh preparatov na pochki tutovogo shelkopryada. Statya. «Rossiyskaya nauka v sovremennom mire» XXXVIII mejdunarodnaya nauchno-prakticheskaya konferentsiya, Moskva, 31 maya 2021, s. 18-20.

Göndərilib: 29.12.2023 Qəbul edilib: 28.01.2024

DOI: https://doi.org/10.36719/2707-1146/42/40-44

**Çilənay İbrahimova**
Həsən Əliyev adına Naxçıvan Kənd Təsərrüfatı
Elmi Tədqiqat İnstitutu
magistrant
pcilenay@gmail.com
**Gülgəz Məmmədova**
Həsən Əliyev adına Naxçıvan Kənd Təsərrüfatı
Elmi Tədqiqat İnstitutu
magistrant
gulmemmedova091@gmail.com
**Güləsər Qasımova**
Həsən Əliyev adına Naxçıvan Kənd Təsərrüfatı
Elmi Tədqiqat İnstitutu
gulasargasimova6@gmail.com

# NAXÇIVAN MUXTAR RESPUBLİKASINDA SARKOSPORİDLƏRİN TƏDQİQİ

**Xülasə**

Məqalədə sarkosporidilərin kənd təsərrüfatı heyvanlarını yoluxdurması, fermer təsərrüfatlarına xeyli ziyan vurması və məhsuldarlığın aşağı düşməsi qeyd edilir. Sarkosporidioz xəstəliyinin Naxçıvan Muxtar Respublikası ərazisində yayılma intensivliyi, eyni zamanda ən çox parazitlik edən növlərin aşkar edilməsi və ona qarşı mübarizə tədbirlərinin tətbiq edilməsi qeyd edilib. Parazitin orqanizmə təsiri bir çox faktorlardan-parazitin növündən, onun virulentliyindən, sayından, lokalizasiya olunduğu yerdən, inkişaf biologiyasından və orqanizmin fizioloji vəziyyətindən asıllığı qeyd edilib. Eyni zamanda parazitin virulentliyi, parazit-sahib münasibətləri qeyd olunub.

***Açar sözlər:*** *sarkosporidi, aralıq sahib, əsas sahib, sporosista, toxuma*

**Chilanay Ibrahimova**
Nakhchivan Agricultural Scientific Research
Institute named after Hasan Aliyev
Graduate student
pcilenay@gmail.com
**Gulgez Mammadova**
Nakhchivan Agricultural Scientific Research
Institute named after Hasan Aliyev
Graduate student
gulmemmedova091@gmail.com
**Gulesar Gasimova**
Nakhchivan Agricultural Scientific Research
Institute named after Hasan Aliyev
gulasargasimova6@gmail.com

## Study of sarcosporidae in Nakchivan Autonomous Republic

**Abstract**

The article mentions that sarcosporids infect agricultural animals, cause considerable damage to farms and reduce productivity. The intensity of the spread of sarcosporidiosis in the territory of the Nakhchivan Autonomous Republic, as well as the detection of the most parasitic species and the implementation of measures to combat it, were noted. The effect of the parasite on the body depends on many factors: the type of parasite, its virulence, number, localization, developmental

biology and the physiological state of the body. The virulence of the parasite and the relationship between the parasite and the host were also noted.

***Keywords:*** *sarcosporidis, intermediate host, primary host, sporocyst, tissue*

## Giriş

Heyvandarlıq kənd təsərrüfatının ən mühüm sahələrindən biridir. Ona görə, əhalinin rifahının yaxşılaşdırılmasında heyvandarlıq məhsullarının artırılması və keyfiyyətinin yüksəldilməsi mühüm rol oynayır.

Son illər baytarlıq elm və praktikası invazion xəstəliklərin profilaktika və mübarizəsi yönündə xeyli irəliləyişlərə nail olmuşdur. Bir çox invazion xəstəliklər ləğv edilmiş, bəzi xəstəliklərə isə nadir hallarda rast gəlinir. Ancaq, bəzi invazion xəstəliklər dövri olaraq heyvandarlığa külli miqdarda zərər vurur. Belə xəstəliklərdən biri sarkosporidioz xəstəliyidir (Mahmudov, 1995: 18).

Uzun müddət sarkosporidilərin həyat dövriyyəsini öyrənmək və sistematik yerini müəyyənləşdirmək mümkün olmamışdır. Əvvəllər sarkosporidilərin sistematik vəziyyətinin müəyyən edilməsi zamanı bu parazitin aralıq sahibdə tapılan sistalarının ölçülərinə görə (makro və mikrosista) təsvir edilmiş, növ kimi isə təsvir edilməmişdir. Sonralar sarkosporidilərin həyat dövriyyəsinin öyrənilməsi, onların ətraf mühitdə yayılması ilə bağlı əksər suallara cavab verildiyindən növlərin adı hər iki sahibin adına görə adlandırıldı. Belə sərbəst adlandırmalar anlaşılmazlıq yaratdığından və Zooloji nomenklaturaya uyğun olmadığından alimlər sarkosporidilərə nomenklaturaya uyğun ad verməyi qərara almışlar ( Namazova, 2011: 81).

Son taksonomik sistemdə Sarcocystis cinsinə 189 növ daxil edilmişdir. Hazırda isə bu cinsə daxil edilən növlərin sayı 220-dən çoxdur. (Petras, Dalius, 2012: 49).

Sarkosporidilər N.D.Levaine tərəfindən aşağıdakı kimi sistemləşdirilir.

Yarım aləm: Protozoa

Tip. Apicomplexa

Sinif: Sporozoasina

Yarım sinif: Coccidiasina

Dəstə: Eucoccidiorida

Fəsilə: Sarcosystidae

Cins: Sarcocystis (Levine, Lee, Hunter , Bovee, 1985: 323).

Radçenko və Qaibova sahibin əzələlərində *Sarcocystis* növlərinin sarkosistalarının uzun müddət mövcud olmasını onların struktur xüsusiyyətləri ilə əlaqədar olduğunu qeyd edir. Onlar göstərirlər ki, sarkosistalar xaricdən spesifik çıxıntılara malikdir (Qaibov, 2005: 28).

Müəyyən edilmişdir ki, bəzi *Sarcocystis* növlərinin (*S.atlanticae, S.dugesii, S.gallotiae, S.stehlinii, S.simonyi, S.muris, S.rodentifelis, S.cymruensis*) inkişaf tsiklində cinsiyyətli və qeyri-cinsiyyətsiz mərhələ eyni növ sahibdə başa çatır ( Memmedov, 2010: 858).

Sarkosporidilərin aralıq sahibi olan vəhşi heyvanlarının bu parazitlərlə yoluxma ekstensivliyi və intensivliyi çox yüksək olub, bəzi hallarda 100%-ə çatır (Yolçiyev, Mahmudov, 1997: 36).

**Tədqiqatın məqsədi.** Kompleks parazitoloji və biokimyəvi metodları tətbiq etməklə sarkosporidiozun bəzi yayılma qanununauyğunluqlarını və parazit-sahib sisteminin münasibətlərini öyrənməkdir (Namazova, Məmmədova, 2011: 235).

Göstərilən məqsədin həyata keçirilməsi üçün aşağıdakı məsələlərin həll edilməsi nəzərdə tutulmuşdur:

1. Naxçıvanın müxtəlif ekoloji şəraitə malik ərazilərində heyvanların yaşından, cinsindən, cinsiyyətindən, iqlim şəraitindən və fəsillərdən asılı olaraq sarkosporidilər ilə yoluxma intensivliyi və ekstensivliyinin öyrənilməsi;
2. Rayonların zonal xüsusiyyətlərindən asılı olaraq heyvanların sarkosporidilər ilə yoluxmasını müəyyənləşdirmək;
3. Sarkosporidilər ilə yoluxmuş heyvanların zülal mübadiləsində baş verən dəyişkənlikləri müəyyənləşdirmək;

4. Parazitinin sporosistalarının inkişafı zamanı baş verən metabolik proseslərin bəzi məsələlərinin öyrənilməsidir.

**Material və tədqiqat metodlari.** Tədqiqat üçün materiallar Naxçıvan Muxtar Respublikasının müxtəlif ət-kəsim yerlərindən və müxtəlif yaşdan olan heyvanlardan götürülmüşdür.

Kəsilən qoyunların ürəyi, qaraciyəri, dalağı, dili, qida və tənəffüs boruları, boyun və qarın əzələləri, diafraqması sarkosporidilərin makro və mikrosistaları ilə yoluxması vizual və mikroskopik üsulla yoxlanmışdır. Toxumaların daxilində makrosistaların olduğunu aşkar etmək üçün onlar lanset vasitəsilə şırımlara ayrılmış və müayinə edilmişdir.

Qoyunlardan götürülən toxuma nümunələrində mikrosistaların olduğunu müəyyən etmək üçün kompressori metodundan istifadə edilmişdir (Namazova, Məmmədova, 2012: 216). Bunun üçün hər orqandan çəkisi 50 q olan 5 toxuma nümunəsi götürülmüş, bu da öz növbəsində qayçı vasitəsilə kiçik hissələrə doğranmışdır. Kəsiklərin üzərinə 2-3 damcı (bərabər hissədə 0,5%-li metilen göyünün sulu məhlulu ilə buzlu sirkə turşusu məhlulunun qarışığı) qarışıq əlavə edilmişdir. 5 dəqiqədən sonra onun üzərinə 2-3 damcı 25%-li naşatır spirti məhlulu əlavə edilmiş, sonra təxminən buğda dəni ölçüsündə kəsilib götürülən hissələr kompressorumda sıxılaraq mikroskopun kiçik böyüdücüsü (7x8) altında baxılmış, toxumalarda mikrosistalar aşkar etdikdə onların fotoşəkilləri çəkilmişdir. Mikroskopik tədqiqat zamanı hər kəsikdə sarkosistaların sayı nəzərə alınmış, invaziyanın intensivliyi 1 kəsikdə olan sarkosistaları saymaqla qiymətləndirilmişdir. İnvaziyanın ekstensivliyi bütün yoxlanılmış heyvanlar arasında xəstə heyvanların sayına görə, intensivliyi isə mikrosistalar üçün 1 kəsikdə olan sistaların sayına, makrosistalar üçün isə 3$sm^2$ toxuma kəsiyində tapılan sistaların sayına görə hesablanmışdır.

Naxçıvan şəhər, Babək, Şərur, Sədərək, Kəngərli, Şahbuz, Culfa və Ordubad rayonlarının həyətyanı və fermer təsərrüfatlarında saxlanılıb kəsilən qoyunların S.tenella ilə yoluxmasını müəyyən etmək üçün fərdi ət kəsim məntəqələrində kəsilən 87 baş qoyunun ürək, qida borusu, dil və diafraqma əzələləri tədqiq edilmişdir. Tədqiq edilən bütün yaşdan olan qoyunların ürək, qida borusu, dil və diafraqmaəzələlərindən Sarcocystis tenella aşkar edilmişdir.

Türkiyənin Kırıkkale Bələdiyyə Qurbangahında 2005-ci ilin may-oktyabr aylarında kəsilən 1131 baş heyvanın (814 qoyun və 317 quzu) *Sarcocystis* növləri ilə yoluxması öyrənilmişdir (Aydenizöz, Karaer, Aycan, 2007: 274).

Digər bir tədqiqat işi 2 ət kəsim məntəqəsində qoyunların *Sarcocystis* ilə yoluxmasının ekstensivliyinin və intensivliyinin öyrənilməsi məqsədi ilə aparılmışdır. Müayinə edilən 38 cəmdəyin 10-nun ancaq qida borusunda makrosistalara təsadüf edilmişdir ( Aldemir, Dik, 2003: 255).

2010-cu ilin may və dekabr aylarında Hakkari Bələdiyə Qurbangahında kəsilən 5 yaşına qədər olan 215 keçinin qida borusu sarkosporidilər ilə yoluxma ekstensivliyi öyrənilmişdir. Müayinə edilən keçilərin 65 başında və ya 30,9%-da makroskopik sistaların, 189 başında (87,5%) isə mikroskopik sistaların olduğu müəyyən edilmişdir (Abdulalim, Göz, 2013: 2).

Türkiyədə qoyunlarda *Sarcocystis* növlərinin yayılmasını araşdırmaq məqsədilə aparılan bir tədqiqat işində 4 fərqli yaş qrupuna daxil edilən 200 baş qoyundan, ümumilikdə toplanan 734 nümunədə *Sarcocystis* cinsinin növlərinin müəyyən edilməsi üçün fermentativ və histoloji müayinə üsullarından istifadə edilmişdir (Tüzer, Demir, 1987: 18; Gaibova, 2005: 45).

**Tədqiqatın nəticələri və onların müzakirəsi.** Ədəbiyyat məlumatlarının təhlili göstərdi ki, qoyunlarda parazitlik edən 4 növdən (Sarcocystis tenella, S.gigantea, S.arieticanis, S.medusiformis) ikisinə (S.gigantea və S.tenella) Azərbaycanda təsadüf olunur. Bu növlərdən də S.tenella daha patogen növ hesab olunur. Bunlardan birincisinin əsas sahibi pişiklər, ikincisinin isə itlərdir. S.giganteanın qoyunlarda təsadüf edilən əsas inkişaf mərhələsi parazitin makrosistaları, S.tenellanın isə mikrosistalarıdır.

Tədqiqat aparılan 8 müxtəlif rayonlarda heyvanlarda parazitlik edən sarkosporidilərin növ tərkibini müəyyən etmək üçün vizual və mikroskopik tədqiqatlar zamanı heyvanların ürəyi, dili, qida borusu, diafraqması və gövdə əzələləri müayinə edilmişdir. Yoxlanılmış orqanlardan S.gigantea sistalarına ancaq qida borusunda təsadüf edilmişdir.




***S.tenella* yoluxmuş qida borusu (1), ürək (2), dil (3), diafraqma (4) əzələləri.**

Tərəfimizdən tapılan S.gigantea sistaları öz morfoloji xüsusiyyətlərinə görə başqa alimlər tərəfindən təsvir olunan göstəricilərinə uyğun gəlir ki, bu da təsvir olunan sistaların S.gigantea sistalarına mənsub olması şübhə doğurmur.

Naxçıvan MR-da qoyunlarda iki növ sarkosporidinin – Sarcosystis gigantea və S.tenella parazitlik etdiyi təsdiq edilmişdir.

Müəyyən edilmişdir ki, muxtar respublika üzrə qoyunların S.gigantea ilə yoluxması 6,1%, S.tenella ilə yoluxması isə 84,8%-dir. S.gigantea sistalarına xüsusilə qida borusu əzələlərində təsadüf edildiyi halda, S.tenellanın qida borusu ilə yanaşı qarın, diafraqma, dil əzələləri və ürəkdə lokalizasiya olunduğu müəyyənləşdirilmişdir.

## Nəticə

1.Ətraf mühitin S.tenella və S.gigantea sporosistaları ilə "çirklənməsi" nəticəsində qoyunları yoluxmadan qorumaq məqsədilə heyvanlar saxlanılan binaların sanitariya vəziyyətinə, heyvanların saxlanılma şəraitinə, qidanın, yemin, suyun təmizliyinə diqqət yetirilməlidir. Parazitlərin əsas sahibi olan itlər və pişiklər S.tenella və S.gigantea sporosistalarını kütləvi şəkildə yaydığı üçün, heyvanların saxlanıldığı ərazidən təcrid olunmalıdır.

2.Tədqiqatların nəticələrindən sarkosporidioza qarşı mübarizə tədbirlərinin hazırlanmasında, tədris prosesində istifadə edilə bilər.

## Ədəbiyyat

1. Mahmudov, S.Ç. (1995). Azərbaycanda qoyunların və camışların sarkosporidiozları (parazitoloji və biokimyəvi baxış). Biol. elm. nam. avtoref., Bakı, 18s.
2. Namazova, A.A. (2010). Azərbaycanda qoyunların Sarcocystis tenella ilə yaşa görə yoluxması // Azərbaycan Zooloqlar Cəmiyyətinin Əsərləri, Bakı, cild 2, s. 80-83.

3. Petras, P., Dalius, B. (2012). Protozoan parasites from genus Sarcocystis and their investigations in Lithuania // Ekologija. v. 58, №1, pp.45–58.
4. Levine, N.D., Lee, J.J., Hunter, S.H., Bovee, E.C. (1985). Phylum II. Apicomplexa Levine 1970. In ‘‘An Illustrated Guide to the Protozoa’’, pp. 322–374.
5. Namazova, A.A., Məmmədova, M.Ə. (2012). Qoyunların sarkosporidilərlə (Protozoa, Apicomplexa, Coccidia) yoluxmasının sahibin cinsiyyətindən asılılığı //AMEA Zoologiya İnstitutunun Əsərləri, cild XXX, №1, Bakı, s.214-220.
6. Yolçiyev, Y.Y, Mahmudov, S.Ç. (1997). Azərbaycanda camışların sarkosporidio-zunun epizotologiyası (Sarcocystis fusiformis) // Azərb. EA Xəbərləri, biol. elm. ser, № 1-6, s.30-38.
7. Abdulalim, A, Göz, Y. (2013). Hakkari Belediye Mezbahasında Kesilen Keçilerde Sarcosporidiosis’in Yaygınlığı . YYU Veteriner Fakültesi Dergisi, c.24, №1, s.1-3.
8. Aldemir, O.S., Dik, B. (2003). Koyunlardaki Sarcocystis türlerinin RAPD-PCR ile teşhisi. Türkiye Parazitol Derg, №27(4), pp.255-259.
9. Aydenizöz, M.Ö., Karaer, Z, Aycan, N.I. (2007). Kirikkale belediye mezbahasinda kesilen koyunlarda sarcocystis türlerinin yayginliği. Türkiye Parazitoloji Dergisi, V.31 №4, pp.272-276.
10. Memmedov, İ. (2010). Nahcivan özerk cumhuriyetinde bazi kanatlilarda sarcocystis türlerinin yayginliği. Kafkas Univ Vet Fak Derg, v.16, №5, s.857-860.
11. Tüzer.E, Demir.S. (1987). Bursa yöresinde koyunlarda Sarcosporidiosis // Vet Fak Derg, v.13, №1, p.12-20.
12. Gaibova, G.D. (2005). Koktsidii (Coccidia, Sporozoa) Azerbaydjana i morfo-funktsionalnie osobennosti i ix jiznennyx tsiklov. Avtoref. dis. dok. biol. nauk, Baku, 45 s.

Göndərilib: 12.02.2024 Qəbul edilib: 05.03.2024

## YER ELMLƏRİ VƏ COĞRAFİYA

## EARTH SCIENCES AND GEOGRAPHY

DOI: https://doi.org/10.36719/2707-1146/42/45-49

**Suleyman Alizadeh**
Azerbaijan Tourism and Management University
master student
suleymanalizada2@gmail.com

# ANALYSIS OF THE PROTECTION OF CLIMATE AND THALASSOTHERAPY RESOURCES OF AZERBAIJAN DURING THEIR USE FOR TOURISM PURPOSES AND THE MAIN FACTORS TO BE TAKEN INTO ACCOUNT

**Abstract**

Climate and thalassotherapy tourism is directly related to nature and the environment, and the development of this field of tourism should be developed symbiotically with the protection and efficient use of natural resources. Since ancient times, the use of mineral waters for therapeutic purposes and the use of areas with a pure climate for the recreation of the population have led to a sharp decrease in the volume of these resources in many countries, or even to their failure. On the other hand, the massive development of tourism in the modern era and its transformation into an international field paves the way for the direct or indirect use of natural resources during this process. In our country, the history of this field of tourism based on ancient traditions increases the importance of protecting the used natural resources.

The main purpose of the article is to carry out a detailed analysis of the main factors that arise during the tourism use of climate and thalassotherapy natural resources, to discuss the existing and potentially future methods using the scientific literature in this field. The possibilities of analysis, induction, and deduction methods were used in writing the article, and the results were recorded systematically.

***Keywords:*** *climate resources, thalassotherapy tourism, environment protection, natural resources, tourism development*

**Süleyman Əlizadə**
Azərbaycan Turizm və Menecment Universiteti
magistrant
suleymanalizada2@gmail.com

# İqlim və talassoterapiya resurslarının turizm məqsədləri üçün istifadəsi zamanı onların qorunması və nəzərə alınmalı əsas amillərin təhlili

**Xülasə**

İqlim və talassoterapiya turizmi birbaşa təbiət və ətraf-mühitlə əlaqələdir və turimin bu sahəsinin inkişafı təbii ehtiyatların qorunması və səmərəli istifadəsi ilə simbiotik olaraq inkişaf etdirilməlidir. Qədim zamanlardan bəri mineral suların müalicəvi məqsədlər üçün istifadəsi və saf iqlimə malik ərazilərin əhalinin istirahəti üçün istifadə edilməsi bir çox ölkələrdə bu ehtiyatlarının həcminin kəskin azalmasına, hətta sıradan çıxmasına gətirib çıxarmışdır. Digər tərəfdən isə müasir dövrdə turizmin kütləvi şəkildə inkişafı və beynəlxalq bir sahəyə çevrilməsi bu proses zamanı təbii ehtiyatların bilavasitə və ya dolayı yolla istifadəsinə yol açır. Ölkəmizdə isə turizmin bu sahəsinin qədim ənənələrə dayanan tarixi istifadə edilən təbii ehtiyatların qorunmasının əhəmiyyətini daha da artırır.

Məqalənin əsas məqsədi iqlim və talassoterapiya təbii ehtiyatlarının turizm məqsədi istifadəsi zamanı ortaya çıxan əsas amillərin detallı təhlilini aparmaq, bu sahə üzrə olan elmi ədəbiyyatdan istifadə edərək mövcud və gələcəkdə potensial olaraq inkişaf etdirilə biləcək metodların müzakirəsini həyata keçirməkdir. Məqalənin yazılmasında analiz, induksiya, deduksiya metodlarınının imkanlarından istifadə edilmiş, nəticələr isə sistemli şəkildə qeyd olunmuşdur.

***Açar sözlər***: *iqlim ehtiyatları, talassoterapiya turimi, ətraf-mühitin qoruması, təbii resurslar, turizmin inkişafı*

## Introduction

Thallasotherapy and climate tourism sectors are developing both in terms of the number of visitors and the areas they cover. These ares of tourism are heavily dependent on natural resources as they form the basis of the activities related, including balneotherapy, thermal therapy and heliotherapy. History of climate and thallostherapy tourism facilities dates back to ancient Roman and Greek civilisations as they benefitted from these resources proactively by constructing hot-air bathes referred to as 'laconica' (Constantin, Diana, 2019: 441).

Health tourism in Azerbaijan entails various forms of climate and thallostherapy tourism and its history dates back to the 12th century. Professional climate and thallasotherapy facilities started to be built in the 20th century and are widespread in all regions of the country. Mountainous and diverse ranges of the relief in Azerbaijan allows for the development of subtropical and temperate climate zones in lowland and highland areas of the country, respectively. This creates excellent opportunities to benefit from the resources of diverse climate conditions and mineral water resources altogether (2).

On the other hand, contemporary ecological and social problems highlight the importance of sustainable tourism and protection of nature and the interests of local communities while engaging in tourism activities. For instance, the UN urges tourism facilitators to cut down carbon emissions at least by 50% over the next decade by following Glasgow Decleration on Climate Action in Tourism and its 5 pillars, namely measure, decarbonize, regenerate, collaborate, finance (3,4).

Furthermore, factors to be taken into accounting while engaging in thalassotherapy and climate tourism activities are not confined to climate and covers a wide spectrum, including pursuing well-being of local communities. This requires in-depth research of the mentioned factors with additional scrutinity which will contribute to the literature in this field.

**Climate and thalassotherapy resouces of Azerbaijan and their dispersion.**

Azerbaijan has an excellent level of mineral water resources and climate conditions which are renowned for their healing properties. Starting from minereal water springs between 4 and 64°C. The coldest mineral water sources are found close to Shahdag, Khinalig, and Tufandag, which are covered in snow. Mineral waters can be categorised using the temperature indicators as indicated in the table below, taking into consideration the effects of temperature on human health, their applicability and potential for tressatment, and the unique qualities of the source's natural conditions:

| *Groups* | *Temperature range* | *Number of sources* | *Chemical composition* | *Areal range* |
|---|---|---|---|---|
| Cold | 0-17 | 31 | Carbonate | Nakhchivan, Gadabay, Tovuz |
| Cool | 7-12 | 133 | Hydro-carbonate and carbonate | Shusha, Lachin, Gadabay, Dashkesen |
| Temperate | 12-20 | 140 | Natrium-chloride and carbonate | Shaki-Zaqatala, Daghlig Shirvan, Guba-Khachmaz |
| Hot | 20-37 | 157 | Hydrogen-sulfide, methane, sulfuric | Absheron, Nabran, Lankaran zone |
| Very hot | 37-40 | 36 | Sulfide, sulfuric | Absheron, Talysh, Kalbajar |

Source: (Sultanova et al., 2017: 215).

Regarding climate conditions, the republic has a highly broad range of climates. Our territory's subtropical location and the yearly entry of several air masses are the main causes of the aforementioned diversity. Furthermore, it should be mentioned that 35% of our land is in the temperate zone and the remaining 65% is in a dry subtropical environment. The country's diverse topography, including its large number of mountainous regions, has contributed to its diverse range of climates. Thus, nine distinct climates are produced in the nation based on the vertical belt and the distribution of rainfall. This has stimulated the growth of many forms of tourism. In the plains and foothills of the country, the average yearly temperature is typically above 10°C, and the winters are pleasant. This area has a large amount of sunny days, which is advantageous for heliotherapy treatments (Sultanova et al., 2017).

**Protection of environment as an important factor.**

Environmental protection plays a pivotal role in the development of thalassotherapy and climate tourism. Thalassotherapy, which involves the therapeutic use of seawater and marine elements, relies heavily on the preservation of marine ecosystems. Sustainable practices such as responsible waste management, protection of coastal areas, and minimizing pollution are essential to ensure the health and vitality of marine environments, which are the foundation of thalassotherapy.

Similarly, climate tourism, which involves traveling to destinations for the purpose of experiencing specific climates or natural phenomena, depends on the preservation of diverse ecosystems and stable climatic conditions. Climate change poses a significant threat to the viability of such destinations, making it imperaative to adopt strategies that mitigate carbon emissions, conserve natural habitats, and promote environmentally-friendly tourism practices.

In both cases, environmental protection is not only a moral imperative but also a practical necessity for the long-term sustainability of thalassotherapy and climate tourism industries. By prioritizing conservation efforts and implementing sustainable practices, stakeholders can ensure that these forms of tourism continue to thrive while minimizing their ecological footprint and safeguarding the natural resources on which they depend (6).

Generally speaking, we can describe the whole process as the following bullet points:

- Preservation of natural recreation areas' biological diversity;
- Raising the degree of economic sustainability in the ecotourism-related regions;
- Enhancing the ecological awareness of those taking part in ecotourism;
- Preserving recreation places' ethnographic status and preservation of natural recreation areas' biological variety.

The overall process can be grouped into two main phases which are crucial to be implemented with a stringent approach:

Planning phase: In a designated region, the following actions should be taken, at the very least: evaluation of the area's recreational potential; formulation of an environmental strategy in tandem with the area's marketing plan; contemplation of either short-term or long-term activities within the bounds of the law; incorporation of environmental controls into the business plan.

The organisational stage: This includes working with various state level structures on legal and environmental matters, developing an investment package for environmental concerns, offering steps to lessen the risk associated with recreation that could arise from such activities, etc.

An essential component of the environmental management programme is thought to be motivation. It is important to support the organisers and executors of ecological tourism activities in their self-affirmation and to meet their material and ethical demands.

The organisational step includes developing an investment package on environmental issues, collaborating with various state level entities on legal and environmental matters, and providing measures (Aliyev, Suleymanov, 2023).

**Social responsibility and supporting local communities**

Developments in thalassotherapy and climate tourism are largely dependent on social considerations and community support. The health of the local population and ecosystems is closely related to coastal regions and natural environments, where these types of tourism regularly cross.

Participating local communities in the development and implementation of tourism programmes guarantees that their opinions are heard and that their needs are taken into consideration, which promotes a feeling of pride and ownership in the preservation of their environment. This involvement may result in more environmentally friendly resource management techniques and more involvement in conservation initiatives, protecting the ecological integrity of coastal regions and marine habitats that are essential to thalassotherapy (8,9).

Furthermore, there are numerous socioeconomic advantages to promoting local communities through tourism-related projects. Through the provision of job opportunities, skill development initiatives, and local sourcing of goods and services, tourism has the potential to boost economic growth and mitigate poverty in these areas. The money received from tourism-related activities can also be used to fund infrastructure improvements, healthcare, education, and other community development initiatives, all of which will raise the standard of living for locals. Furthermore, preserving local identities and promoting cultural heritage and customs through tourist experiences can improve social cohesion and promote mutual respect and understanding between visitors and host communities. Thus, stakeholders can establish more inclusive and sustainable thalassotherapy and climate tourism by giving local community support top priority and taking social factors into account (10,11).

Finally, there is also an important factor to consider in terms of cultural conservation and social cohesiveness. Deeper respect and understanding between visitors and host communities can be fostered through tourism experiences that embrace and showcase local identities, cultures, and customs. Destinations can enhance visitor experiences and preserve and promote local heritage at the same time by integrating culturally significant elements into tourism projects, such as customs, artisanal workmanship, and culinary traditions. This strategy improves the quality of the tourism experience overall and reinforces social cohesion by encouraging locals to feel proud of their cultural identity and promoting meaningful interactions between tourists and locals (Smith, Edwards, 2006, 92).

## Conclusion

In summary, thalassotherapy and climate tourism are the result of a careful balancing act between utilising the healing properties of natural resources and making sure they are preserved for future generations. The historical relevance of these customs, which date back to prehistoric societies, emphasises how crucial it is to protect pure climates and mineral waters for medical and recreational uses. Thalassotherapy and climate tourism are growing in popularity, and Azerbaijan is well-positioned to benefit from this trend thanks to its varied natural landscapes and long tradition of providing health tourism. However, it is crucial that tourism development policies give sustainability and environmental stewardship top priority in light of modern environmental issues including habitat degradation and climate change. Stakeholders can lessen the detrimental effects of tourism on the environment by encouraging responsible behaviour and including conservation measures into tourism planning.

Furthermore, it is impossible to ignore the social aspects of climate tourism and thalassotherapy. Fostering a feeling of pride and ownership in the protection of natural resources requires active engagement with local communities and respect for their cultural heritage. Tourism may become a force for good, bringing people out of poverty and improving their quality of life, by boosting local economies, creating jobs, and funding community development initiatives.

More social cohesiveness and understanding between tourists and host communities can also be achieved by supporting sustainable tourism practices and social responsibility within the tourism sector. In summary, thalassotherapy and climate tourism can fully realise their potential as catalysts for sustainable development while preserving the natural and cultural heritage that makes them so valuable by adopting a comprehensive strategy that incorporates environmental protection, social responsibility, and economic development.

## References

1. Munteanu, C., Munteanu, D. (2019). Thalassotherapy today. Balneo Research Journal, 10(4), 440-444.
2. https://tourism.gov.az/uploads/documents/sa%C4%9Flaml%C4%B1q_turizmi_haqq%C4%B1nda__hesabat_dta.pdf
3. https://www.oneplanetnetwork.org/programmes/sustainable-tourism/glasgow-declaration
4. https://www.unwto.org/sustainable-development/climate-action
5. Soltanova, H., Qasımov, M., Ağasiyev Ə. (2017). Azərbaycanın kurort təsərrüfatı. Bakı: 215 s.
6. https://ikisahil.az/post/227916-eko-turizm-tebietin-qorunmasina-mane-olmamalidir
7. Aliyev, V., Suleymanov, F. (2023). The protection of water resources for sustainable tourism under climate change in South Caucasus: in the context of Azerbaijan. GeoJournal of Tourism and Geosites, 47(2), 515-522.
8. https://vetennamine.az/davamli-turizmin-yuks%C9%99lisi-islandiyadan-d%C9%99rsl%C9%99r/
9. Tahir, Z., Rafiq, G. (2021). Sustainable development of the tourism industry in Azerbaijan. Universidad y Sociedad, 13(1), 43-50.
10. https://estafet.az/az/news/id-3459
11. https://kitabxana.net/files/books/file/1534167018.pdf
12. Smith, M. K., Robinson, M. (Eds.). (2006). Cultural tourism in a changing world: Politics, participation and (re) presentation (Vol. 7). Channel view publications.

Received: 16.01.2024 Accepted: 26.02.2024

# İÇİNDƏKİLƏR

## TİBB VƏ ƏCZAÇILIQ ELMLƏRİ

## MEDICINE AND PHARMACEUTICAL SCIENCES



## KİMYA

## CHEMISTRY



## BİOLOGİYA ELMLƏRİ VƏ AQRAR ELMLƏR

## BIOLOGICAL SCIENCES AND AGRARIAN SCIENCES



## YER ELMLƏRİ VƏ COĞRAFİYA

## EARTH SCIENCES AND GEOGRAPHY

